# TƏBRİK EDİRİK!

## RƏNA İSLAM QIZI MIRZƏZADƏ --60



Azərbaycan Milli Elmlər Akademiyası - Torpaqşünaslıq və Aqrokimya İnstitutunun "Torpaqların genezisi, coğrafiyası və xəritəçiliyi" laboratoriyası nəzdindəki "Torpaq muzeyi" qrupunun rəhbəri, dosent, aparıcı elmi işçi, aqrar elmlər üzrə fəlsəfə doktoru Rəna İslam qızı Mirzəzadə 1959-cu ilin aprel ayında Bakı şəhərində anadan olmuşdur.

R.Mirzəzadə 1983-cü ildə Azərbaycan Dövlət Universitetinin "Biologiya" fakültəsini bitirmiş təyinatla gənc mütəxəsis kimi AMEA-nın Torpaqşunaslıq və Aqrokimya İnstitutuna göndərilmişdir.

Rəna xanım 1985-ci ildən Torpaqşunaslıq və Aqrokimya İnstitutununn torpaqların genezisi, coğrafiyası və xəritəciliyi laboratoriyasında analitik mühəndis kimi elmi fəaliyyətə başlamış, kiçik elmi işçi, elmi işçi, böyük elmi işçi olmuş və hazırda aparıcı elmi işçi vəzifəsində çalışır.

O işlədiyi müddət ərzində özünü təşəbbüskar, bilikli mütəxəssis kimi göstərmiş və 1998-ci ildə "Suvarılan boz-qonur torpaqların antropogen təsirdən dəyişilməsi və onun məhsuldarlıq qabiliyyəti "mövzusu üzrə namizədlik dissertasiyasını müvəffəqiyyətlə müdafiə etmiş və Kənd təsərrüfatı elmləri namizədi alimlik dərəcəsini almışdır.

Rəna Mirzəzadə İnstitutun həyatında fəal iştirakı ilə tanınır. O, 2008-ci ildə İnstitutda muzey işinin təşkilində yaxından iştirak etmiş və muzeyin layiqincə alınmasında xüsusi fəallıq göstərmişdir.

AMEA-nın Torpaqşunaslıq və Aqrokimya İnstitutunun "Torpaq muzeyi" torpaq iqlim zonalarını əhatə edən 50-dən çox torpaq monolitləri əsasında yaradılıb. Bu respublikamızın torpaq örtüyünün qızıl fondu olub, eyni zamanda, genetik ehtiyatların öyrənilməsində xüsusi rol oynayır. İnstitutun 70- illik fəaliyyəti dövründə toplanmış eksponatlar bəzi muzeylərdə nümayiş olunur.

"Torpaq muzeyi" torpaqşunaslıq, aqrokimya və ekologiya sahəsində Azərbaycan alimlərinin başlıca mühafizəkarı rolunda çıxış edir.

Dosent Rəna Mirzəzadə hazırda laboratoriyanın tematik planına uyğun" Azərbaycanın müxtəlif şəraitində formalaşan zonalarda torpaq, təsnifatının inkişaf tarixinin araşdırılması" mövzusu üzrə müstəqil iş aparır. Onun 87 elmi əsəri, o cümlədən, 3 kitabçası 2 tövsiyə, biblioqrafiya, məqalə və tezisləri yerli və xarici mətbuatlarda çap edilmişdir.

AMEA- nın 70 illik yubiliyi münasibəti ilə Rəna xanım Mirzəzadə məhsuldar elmi və elmi içtimai fəaliyyətinə görə Fəxri Fərmanla təltif edilmişdir. Dəfələrlə xarici şəhər və ölkələrdə (Moskva, Sank-Peterburq, Rostov-Don, Türkiyə, Avstriya, Almaniya, İtaliya, Fransa və s.) keçirilen konfrans və konqreslərin iştirakçısı olmuş və məruzə ilə cıxış etmişdir.

2011-ci ildə Azərbaycan Qadınlar Cəmiyyətinin 90 illik yubileyinə həsr olunmuş "Müstəqil Azərbaycan Qadını" kitabında Rəna xanım Mirzəzadə barədə xoş sözlər deyilmişdir.

İnstitutun rəhbərliyi və kollektivi institutun əməkdaşı Rəna İslam qızı Mirzəzadənin 60- illik yubileyi münasibəti ilə ürəkdən təbrik edir, ona sağlamlıq və uğurlar arzulayır.

**Əlövsət QULİYEV**
**AMEA-nın Torpaqşunaslıq və Aqrokimya İnstitutunun direktoru**

# DAĞISTAN ZEYNALABDİN OĞLU ŞABANDAYEV – 70

Dağıstan Zeynalabdin oğlu Şabandayev 1949-cu il aprelin 5-də Qərbi Azərbaycanın Göyçə mahalının Basarkeçər rayonunun Pəmbək kəndində anadan olmuşdur. 1967-ci ildə Basarkeçər rayonunun Şişqaya kənd orta məktəbini bitirib, həmin ildə Azərbaycan Dövlət Aqrar Universitetinin aqronomluq fakültəsinə daxil olmuş və 1972-ci ildə universiteti bitirmişdir.

1972-ci ildə Kənd Təsərrüfatı Nazirliyi Bakı zona aqrokimya laboratoriyasında torpaqşünas-aqrokimyaçı vəzifəsində əmək fəaliyyətə başlamışdır. 1972-1973-cü illərdə hərbi xidmətdə olmuşdur. 1974-cü ildə Kənd Təsərrüfatı Nazirliyi Elmi Tədqiqat Eroziya və Suvarma İnstitutunda aspiranturaya daxil olub, 1981-ci ilə qədər orada baş laborant və elmi işçi vəzifəsində işləmişdir. 1985-ci ildə namizədlik disertasiyası müdafiə edərək aqrar elmləri üzrə fəlsəfə doktoru alimlik dərəcəsi almışdır.

1981-ci ildə Kənd Təsərrüfatı Nazirinin əmri ilə Nazirliyin Baş Əkinçilik idarəsinə baş aqronom vəzifəsinə təyin olunmuşdur. 1986-1989-cu illərdə Azərbaycan Respublikası Dövlət Aqrar-Sənaye Komitəsində şöbə müdiri işləmişdir. 1989-1998-ci illərdə Kənd Təsərrüfatı Nazirliyinin Bitkiçilik idarəsində baş aqranom vəzifəsində çalışmışdır. 1998-2000-ci illərdə Kənd Təsərrüfatı Nazirliyi yanında Kənd Təsərrüfatı Kreditləri üzrə Dövlət Agentliyində Dünya Bankı ilə Azərbaycan Hökümətini birgə maliyyələşdirdiyi Beynəlxalq layihələrdə, “Təsərrüfatların Özəlləşdirilməsi Layihəsi”ndə yaşayış məntəqələrinin inkişaf komponentinin rəhbəri, 2000-ci ildən 2012-ci ilədək “Kənd Təsərrüfatının İnkişafı və Kreditləşməsi Layihəsi”nin İnformasiya Məsləhət Mərkəzində müqavilə və monitorinq üzrə mütəxəssis vəzifələrində işləmişdir. 2012-2015-ci illərdə İslam İnkişaf Bankı ilə İFAD-din birgə maliyyələşdirdiyi “Şimal-Qərb Kənd İnkişafı Layihəsi”ndə məsləhətçi və Kənd Yerlərinin Komplek İnkişafı Layihəsində isə “Təbii Resursların Yaxşılaşdırılması və Landşaftın Bərpası” üzrə komponent rəhbəri vəzifəsində, ümumiyyətlə 5 beynəlxalq layihələrdə xüsusi fəaliyyəti olmuşdur. Layihələrdə işlədiyi dövrlərə əlavə təhsil sahəsi üzrə 2000-ci ildə Bakı şəhərində Bilik yayımı və Məsləhət xidmətləri üzrə beynəlxalq məsləhətçinin iştirakı ilə keçilmiş baş təlimatçı, 2002-2003-cü illərdə “Biznesin (fermer təsərrüfatlarının) idarə edilməsi və Hüquq məsələlər” mövzusunda təlim kurslarında iştirak etmişdir. 2004-cü ildə Türkiyə Respublikasında Kənd Təsərrüfatının bilik və informasiya sistemində İnformasiya və Məsləhət Xidməti üzrə beynəlxalq təlim kursunda iştirak



etmiş və bu sahə üzrə sertifikatlar almışdır. 2009-cu ildə “Kənd Təsərrüfatı Xidmətlərinin monitorinqi və idarə edilməsi” mövzusunda beynəlxalq məsləhətçi tərəfindən keçirilmiş təlim kursunun iştirakçısı olmuşdur.

2016-cı ildən Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyinin Tərəvəzçilik Elmi Tədqiqat İnstitutunda “Becərmə texnologiyası laboratoriyasın”da aparıcı elmi işçi vəzifəsində elmi fəaliyyətinin davam etdirir.

4 kitabın (“Əkinçinin illik fəaliyyət təqvimi”-2013, “Azərbaycanda yetişdirilən əsas meyvə və tərəvəz bitkiləri haqqında qısa məlumat”-2015, “Fermerlər əkinçilikdə nəyi bilməlidirlər”-2018 və “Sarımsaq botaniki və aqrobioloji xüsusiyyətləri”2019), 41 elmi əsərin və bir səmərələşdirici təklifin (№388 10 may 1979) müəllifidir.

D.Z.Şabandayev öz əməksevərliyi, zəhmətkeşliyi ilə Tərəvəzçilik ET İnstitutunun kollektivinin hörmətini və rəğbətini qazanmışdır.

Tərəvəzçilik Elmi Tədqiqat İnstitutunun rəhbərliyi və kollektivi institutun əməkdaşı Dağıstan Zeynalabdin oğlu Şabandayevi 70 illik yubileyi münasibətilə təbrik edir, ona can sağlığı və uzun ömür arzulayır.

***Elmar Allahverdiyev***
Tərəvəzçilik ET İnstitutunun direktoru
***Şəban Maxsudov***
Tərəvəzçilik ET İnstitutunun Həmkarlar Komitəsinin sədri

# ALLAH RƏHMƏT ELƏSİN!

**ƏLVERDİ ƏLMURAD OĞLU ALLAHVERDİYEV – 64**

*Azərbaycan Dövlət Aqrar Universitetinin Meliorasiya və Hidrotexniki Qurğular kafedrasının dosenti, texnika elmləri namizədi Əlverdi Əlmurad oğlu Allahverdiyev yaşasaydı aprel ayının 8-i 64 yaşı tamam olacaqdı.*

Vətəninə canı qədər bağlı, zətmətkeş, vətənpərvər ziyalı, müdrik insan Əlverdi Əlmurad oğlu Allahverdiyev 1955-ci ildə bütöv Azərbaycanın tərkib hissəsi, əzəli və əbədi torpaqlarımız olan Qərbi Azərbaycanın Zəngəzur dağlarının ətəklərində, Araz çayının sahilində yerləşən, ötən əsrin yetmişinci illərindən alimlər kəndi kimi tanınan 1500 nəfər əhalisinin 50-dən çoxu elm xadimi olan, 1988-1991 Ermənistanda qalan yeganə azərbaycanlılar yaşayan kənd kimi, erməni vandallarının hücumlarını 3 il təkbaşına mərdliklə dəf edərək, yenilməzlik rəmzi, qeyrət qalası olan Mehri rayonunun Nüvədi kəndində sadə kolxozçu ailəsində anadan olmuşdur.

Nüvədi kəndi 1929-cu ilin fevralın 18-də Zaqafqaziya Federasiyasının qərarı ilə Zəngilan rayonundan alınıb Ermənistana verilsə də uzun müddət Zəngilan rayonunun tabeliyində qalmışdır.

Ə. Allahverdiyev 1972-ci ildə Nüvədi kənd orta məktəbini bitirmiş və həmin ili Azərbaycan Dövlət Kənd Təsərrüfatı İnstitutunun “Kənd təsərrüfatının mexanikləşdirilməsi” fakültəsinə daxil olmuşdur. institutu bitirərək təyinatla öz doğma el obasına, Nüvədi kəndinə qayıtmışdır.

O, 1977-1978-ci illərdə Nüvədi kənd “Qırmızı sərhəd” kolxozunda mexanik vəzifəsində, 1979-1980-ci illərdə Nüvədi kənd orta məktəbində traktor üzrə təlimatçı müəllim işləmişdir.

Elmə olan sonsuz həvəsi onu yenidən oxuduğu AKTİ-na indiki Azərbaycan Dövlət Aqrar Universitetinə qaytarmışdır.

1979-1983-cü illərdə Azərbaycan Elmi-Tədqiqat Kənd Təsərrüfatının Mexanikləşdirilməsi və Elektrikləşdirilməsi İnstitutunun Maşınlar sistemi laboratoriyasının qiyabi aspiranturasına daxil olmuş “Suvarılan ərazilərdəki çoxillik əkinlərdə istifadə üçün frezli kultivatorun işçi orqanının təkmilləşdirilməsi” mövzusunda dissertasiya işi üzrə tədqiqat aparmışdır.

Ə. Allahverdiyev 1980-1984-cü illərdə Azərbaycan Dövlət Kənd Təsərrüfatı İnstitutunda elmi işçi kimi fəaliyyət göstərmişdir. 1984-1991-ci illərdə Heyvandarlığın mexanikləşdirilməsi kafedrasında baş laborant və laborotoriya müdiri vəzifəsində çalışmışdır.



1990-cı ildə “Suvarılan ərazilərdəki çoxillik əkinlərdə istifadə üçün frezli kultivatorun işçi orqanının təkmilləşdirilməsi” mövzusunda namizədlik dissertasiyası işini uğurla Tiflis şəhərində müdafiə edərək, texnika elmləri namizədi elmi adını almışdır. O, ADAU-nun heyvandarlığın mexanikləşdirilməsi kafedrasında assistent dosent əvəzi, 1999-cu ildən Heyvandarlığın mexanikləşdirilməsi, emal aparatları və sanitariya texnologiyası kafedrasında dosent kimi fəaliyyət göstərmişdir.

1998-1999-cu illərdə Ə. Allahverdiyev Aqrar mühəndislik fakültəsində dekan müavini, 2008-ci ildən isə kredit sistemi üzrə təhsil alan tələbələrə akademik məsləhətçi işləmişdir.

Ə. Allahverdiyev 2003-2008-ci illərdə ADA Elm və xarici əlaqələr şöbəsinin müdiri vəzifəsində çalışarkən Aqrar Universitetdə yüksək ixtisaslı kadr hazırlığında əvəzsiz xidmətlər göstərmişdir.

Azərbaycan Dövlət Aqrar Universitetində ən çox doktorluq dissertasiyası Əlverdi müəllimin Elm və xarici əlaqələr şöbəsinin müdiri olduğu dövrə təsadüf edir. O, elm şöbəsinə rəhbərliyi ərəfəsində Aqrar Universitetdə İran İslam Respublikası, Türkiyə Cümhuriyyəti, Almaniya Federativ Respublikası və Avropa İttifaqı ilə elmi-pedoqoji əməkdaşlıq yaratmağa nail olmuşdur.

Ə. Allahverdiyev 2012–ci ildə Aqrar Universitetdə yeni yaradılmış “Meliorasiya tikintisi və texniki servis“ kafedrasında elmə sonsuz həvəslə yanaşaraq meliorasiya və zəlzələyə davamlılıq elmini tələbələrə tədris etməyə başlamış və milli kadrların hazırlanmasında böyük əmək sərf etmişdir.

Ə.Allahverdiyev suvarma şırımı açmaq üçün frezli kultivatorun işçi orqanından torpaq hissəsinin atılma istiqaməti və məsafəsinin nəzəri təyin edilməsinə nail olmaqla, suyun nopma sürəti ilə torpağın struktur quruluşu arasında nəzəri əlaqə yarada bilmiş və bu kəşfini təsərrüfata tətbiq etmişdir.

Aqrar sahədə çalışan gənc alim və mütəxəssis kimi Ümum respublika Elmi–praktiki konfranslarında fəal iştirakına, maraqlı elmi məruzəsinə, səmərəli fəaliyyətinə, prezident seçkilərində fəal iştirakına və Dünya Azərbaycanlılarının Həmrəyliyi yolunda əsl vətəndaşlıq münasibəti göstərdiyinə görə Universitetin rəhbərliyi tərəfindən dəfələrlə mükafatlandırılmışdır. O, bir çox beynəlxalq konfrans, seminar və simpoziumların iştirakçısı olmuş, həmçinin xarici ölkələrdə, o cümlədən Belçika və Fransada elmi simpoziumlarda iştirak edərək ADAU-nu ləyaqətlə təmsil etmişdir.

Ə. Allahverdiyev təkcə gənc nəslin təlim tərbiyəsi və təhsili ilə deyil, canı qədər sevdiyi vətən torpağının Qərbi Azərbaycanın Nüvədi kəndinin gələcək nəsillər üçün unudulmaması naminə geniş araşdırma aparmışdır. O araşdırmalarında nüvədililər, onların tarixdə yeri, ictimai siyasi və elmi fəaliyyətini öyrənmişdir. O, böyüyüb boya-başa çatdığı kəndin coğrafi obyektlərinin toponimikasını geniş araşdırmış və elmi əsaslandırmışdır. Onun bu fəaliyyətini izləyərkən nə qədər savadlı, geniş təfəkkürə malik, tutarlı dəlillər gətirməyi bacaran, yorulmadan axtarışda olan, sözün həqiqi mənasında dahi əsil insanı itirdiyimizi dərk edirik.

Əlverdi Allahverdiyevin vəfatından sonra onun arxivi araşdırılarkən sonuncu dəfə fəaliyyət göstərdiyi Meliorasiya və hidrotexniki qurğular kafedrasında bakalavr və magistr pilləsi üzrə dərs vəsaitlərinin çatışmadığından yeni dərslik, mühazirə materialları və metodiki vəsaitlər üzərində işlədiyi və tərtibatının yarımçıq qaldığı aydınlaşdı. Beləliklə tərtibatı yarımçıq qalmış materialların bu yaxınlarda oğlu Cavid Muradlı tərəfindən dərs vəsaiti kimi çap edilib Aqrar Universitet tələbələrinə tövhə veriləcəkdir. Onun bu sahədə qoyduğu zəhmət əvəzedilməzdir.

Əlverdi Əlmurad oğlu Allahverdiyev 23 iyul 2018-ci ildə mehriban ailə başçısı, dost və gözəl insan kimi xoş əməlləri ilə birgə qəflətən əbədiyyətə qovuşdu.

Əlverdi müəllim ADAU-nun tələbələrinin, dostlarının, onu tanıyanların qəlbində çox sadə, zarafatcıl, dərin zəkaya, xeyirxahbbir alim–pedaqoq, ən yaxşı məsləhəhçi, unudulmaz şəxsiyyət kimi əbədi yaşayacaqdır.

**İ.CƏFƏROV**
Azərbaycan Dövlət Aqrar Universitetin rektoru
**K.FƏTƏLİYEV**
"Aqromexanika" Elmi Tədqiqat İnstitunun direktoru
**A.SEYİDOV**
Heyvandarlıq Elmi Tədqiqat İnstitutunun
"Arıçılıq " Mərkəzinin rəisi